Azərbaycan Aqrar Elmi 2 2019 Аграрная Наука Азербайджана

UOT 619.576.89; 619.616.995.1

# AZƏRBAYCANDA QOYUNÇULUQ TƏSƏRRÜFATLARINDA HELMİNTOZLARIN YAYILMA DİNAMİKASI

**S.İ.RÜSTƏMOVA**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Aparılan tədqiqat işində əsas məqsəd Respublikanın Şamaxı rayonunda olan fərdi qoyunçuluq təsərrüfatlarında helmintozların yayılmasını müəyyən etməkdir. Müxtəlif yaş qrupunda qoyunlar arasında helmintozların ekstensivlik və intensivliyi müayinələr nəticəsində tədqiq edilmişdir.*

***Açar sözlər:*** *helmintozlar, təsərrüfat, koproloji müayinə, intensivlik, ekstensivlik, yoluxma*

İqtisadiyyatın əsas sahələrindən biri kənd təsərrüfatı hesab olunur. Onun inkişafında heyvandarlıq mühüm sahə sayılır. Qoyunçuluq heyvandarlıqda çox gəlirli sahələrdən biri olub əhalinin ət, ət məhsulları ilə və yüngül sənayenin bir çox sahələrinin xammal ilə təminatında mühüm rol oynayır. Bu gəlirli sahənin inkişafına mane olan amillərdən biri də helmintozlardır (3,4).

İnvazion xəstəliklərə qarşı aparılan əsaslı tədbirlərə baxmayaraq, bir çox helmintozlar heyvanlar arasında geniş yayılaraq təsərrüfatlara çox böyük iqtisadi ziyan vurur. Helmint xəstəlikləri heyvanların tələfatına, məhsulun keyfiyyətinə və itkisinə səbəb olur (5).

Son illərdə xırda buynuzlu heyvanların helmintozlarının yayılmasına, helmintlərin bio-ekoloji xüsusiyyətlərinin öyrənilməsinə aid elmi tədqiqat işləri aparılır (1,2). Qoyunçuluq gəlirli sahə olduğundan Azərbaycanın əksər zonalarında, o cümlədən Şamaxı rayonunda da onun inkişafına xüsusi diqqət yetirilir. Bu da tədqiqat işlərinin aparılmasını labüd edir. Odur ki, Şamaxı rayonunun ərazisində yerləşən fərdi və köçəri təsərrüfatlarda müxtəlif yaşdan olan qoyunlar arasında invaziyanın ekstensivlik və intensivliyini müəyyən etmək qarşıya məqsəd qoyulmuşdur.

**Material və metodlar.** Tədqiqatlar 2016-2017-ci illərdə Şamaxı rayonu ərazisində qoyunçuluq təsərrüfatlardan gətirilmiş patoloji materiallar əsasında yerinə yetirilmişdir.

Yoluxmanın ekstensivliyi koproloji müayinə, intensivliyi isə helmintoloji yarma üsulu ilə müəyyən edilmişdir.

Bu məqsədlə həmin rayonun ərazisində yerləşən fərdi və köçəri qoyunçuluq təsərrüfatlarından 240 başdan müxtəlif yaş qrupları üzrə kal nümunələri götürülmüşdür. Götürülmüş nümunələr Visnyauskas və Fülleborn üsulları ilə müayinə edilmişdir.

Yoluxmanın intensivliyini müayinə etmək üçün K.İ.Skryabinin natamam helmintoloji yarma üsulundan istifadə edilmişdir. Bu məqsədlə fərdi və köçəri qoyunçuluq təsərrüfatlarından, o ərazilərdə olan ət kəsim məntəqələrindən 90 baş qoyunun daxili orqanları yarılaraq müayinə edilmişdir.

## Alınan nəticələr və onların müzakirəsi

Tədqiqatlar qoyunçuluq təsərrüfatlarında koproloji və yarma müayinələrinə əsasən 3-6 aylıq, 1yaş və yaşlılar olan qruplar üzərində aparılmışdır. Belə ki, 3-6 aylıqlarda – monieziozla 22,5%, fassiolyozla 13,8%, diktiokaulyozla 17,5%, trixosefolyozla 26,3% təşkil etmişdir.

1 yaşında olan qoyunlarda monieziozla 18,8%, fassiolyozla 11,3%, diktiokaulyozla 16,5%, trixosefolyozla 20,0%, yaşlılarda isə monieziozla 15,0%, fassiolyozla 7,5%, diktiokaulyozla 12,5%, trixosefolyozla 15,5% yoluxma olduğu müayinələr zamanı aşkar edilmişdir. Alınan nəticələr cədvəl 1-də verilir.

Təsərrüfat üzrə helmintozlarla yoluxma isə monieziozla 18,8%, fassiolyozla 10,8%, diktiokaulyozla 15,4%, trixosefolyozla 20,4% müəyyən edilmişdir (Diaqramm 1).

**Cədvəl 1**
**Helmintlərlə yoluxmuş qoyunlar (koproloji müayinələr əsasında)**

| Yaş qrupları | Müayinə olunmuş heyvanların sayı | Moniezioz | | Fassiolyoz | | Diktiokaul-yoz | | Trixosefal-yoz | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | | Yoluxub | IE% | Yoluxub | IE% | Yoluxub | IE% | Yolu-xub | IE% |
| 3-6 aylıq | 80 | 18 | 22,5 | 11 | 13,8 | 14 | 17,5 | 21 | 26,3 |
| 1yaş | 80 | 15 | 18,8 | 9 | 11,3 | 13 | 16,5 | 16 | 20,0 |
| Yaşlılar | 80 | 12 | 15,0 | 6 | 7,5 | 10 | 12,5 | 12 | 15,5 |
| Cəmi | 240 | 45 | 18,8 | 26 | 10,8 | 37 | 15,4 | 49 | 20,4 |

Aparılan tədqiqatlardan görünür ki, qoyunların helmintlərlə yoluxması yaşdan asılı olaraq dəyişir. 3-6 aylıqlar yaşlı qoyunlara nisbətən helmintlərlə

yoluxmaya daha həssasdırlar. Bu da onlarda immun sistemin zəif olmasından irəli gəlir.




**Diaqramm 1. Qoyunların helmintozlarla yoluxması**

Cədvəl 2

Yarma müayinəsinin nəticələri (ədəd)

| Yaş | Müayinə edilmişdir | *Moniezia expansa* | *Fasciola hepatica* | *Dictyocaulus filaria* | *Trichosephalus ovis* |
|---|---|---|---|---|---|
| 3-6 aylıq | 30 | 3-5 | 5-11 | 8-17 | 7-18 |
| 1 yaş | 30 | 2-4 | 4-9 | 6-16 | 5-14 |
| Yaşlılar | 30 | 2-3 | 3-7 | 5-14 | 4-11 |
| Orta hesabla | 90 | 2-5 | 3-11 | 5-17 | 4-18 |

Müxtəlif yaş qruplarında natamam yarma üsulu ilə invaziyanın intensivliyi müəyyənləşdirilmişdir. Yarma müayinəsi əsasən rayon ərazisində olan ət kəsim məntəqələrində və təsərrüfatda kəsilmiş heyvanlar üzərində aparılmışdır.

Ümumilikdə, 90 baş qoyunun qaraciyər, ağciyər, nazik və kor bağırsaqları üzərində natamam yarma müayinəsi aparılmışdır. Helmintoloji natamam yarma üsulunun nəticələri cədvəl 2-də öz əksini tapmışdır. Cədvəl 2-dən göründüyü kimi invaziyanın intensivliyi orta hesabla *Moniezia expansa* ilə 2-5, *Fasciola hepatica 3-11, Dictyocaulus filaria 5-17, Trichosephalus ovis* 8-18 ədəd olduğu aparılan yarma müayinəsi zamanı müəyyən edilmişdir.

Helmintozların təsərrüfat daxilində yayılmasının öyrənilməsi böyük praktiki və nəzəri əhəmiyyət kəsb edir. Praktiki əhəmiyyəti ilk növbədə xəstəliyin mənşəyinin vaxtında müəyyənləşdirilməsidir. Nəzəri əhəmiyyəti isə təsərrüfat daxilində parazitofaunanın formalaşma qanunauyğunluqlarını müəyyənləşdirməkdir.

**Nəticə:**1. Qoyunçuluq təsərrüfatlarında aparılmış tədqiqatlar nəticəsində müəyyən olundu ki, bu ərazilərdə saxlanılan heyvanlar arasında helmintlər parazitlik edir. İnvaziyanın ekstensivliyinin monieziozla 18,8%, fassiolyozla 10,8%, diktiokaulyozla 15,4%, trixosefolyozla 20,4% olduğu müəyyən edilmişdir.

2. İnvaziyanın intensivliyi orta hesabla *Moniezia expansa* ilə 2-5, *Fasciola hepatica 3-11, Dictyocaulus filaria 5-17, Trichosephalus ovis* 8-18 ədəd olduğu aparılan yarma müayinəsi zamanı müəyyən edilmişdir.

**ƏDƏBİYYAT**


1.Məhərrəmov S.H. Naxçıvan Muxtar respublikasında qoyunların kompleks helmintfaunasının formalaşma xüsusiyyətləri, mədə-bağırsaq nematodlarına qarşı antihelmint bitkilərin tətbiqi və onların toksikoloji qiymətləndirilməsi: Biol. elm. dokt. diss. avtoreferatı. Bakı, 2011, 41 s. 2.Məmmədov E.N., Məmmədov İ.B. Naxçıvan Muxtar Respublikasının aran zonalarında xırdabuynuzlu heyvanların assosiativ invaziyaları//Azərbaycan Aqrar elmi, Bakı, 2011, № 3, s. 81-82. 3.Асадов С.М. Гелминтофауна жвачных животных СССР и ее эколого-географический анализ. Баку, 1960, с. 511. 4.Гапанов С.П. Паразитические нематоды: Учебное пособие, Воронеж, ВПУ, 2004, 75 с. 5.Сафиуллин Р.Т. Распространение и экономический ущерб от основных гельминтозов жвачных животных // Ветеринария, 1997, № 6.с. 28-32.


**Динамика распространения гельминтоза в овцеводческих хозяйствах Азербайджана**


**С.И. Рустамова**



Основной целью проводимой исследовательской работы является определение распространения гельминтоза в частных овцеводческих хозяйствах Шемахинского района Азербайджана. В результате исследований были обследованы интенсивность и экстенсивность гельминтозов среди овец различных возрастных групп.



***Ключевые слова:*** *гельминтоз, хозяйство, копрологическое обследование, интенсивность, экстенсивность, заражение.*


**Dinamic of spreading helmintosis sheep-breeding farms ın Azerbaijan**


**S.İ.Rustamova**



The main goal of our work to determined the spreading of helmintes in sheep-breeding farms of the Shamaxi district. It was defined during inspection intensity and extensity of helmintes in sheeps of different age.



***Key words:*** *helmintosis, farm, comprology inspection, intensivity, extensivity, contamination.*